**UOT333.013.6:351.7.9**

# İNNOVASİYA FƏALİYYƏTİNİN TƏNZİMLƏNMƏSİNDƏ DÖVLƏTİN ROLU

**A.A.HACIYEVA**
**Azərbaycan Dövlət Aqrar Universiteti**

*Məqalədə Azərbaycanda innovasiya fəaliyyətinin inkişafının əsas təmin edilməsi istiqamətləri, eyni zamanda qlobal inkişaf şəraitində innovasiya fəaliyyətinin maliyyə sisteminin təmin edilməsi və innovasiya fəaliyyətinin tənzimlənməsi istiqamətinin formalaşması mexanizmi göstərilir.*

***Acar sözlər****: innovasiya, vergi sistemi, innovasiya fəaliyyəti, maliyyələşmə, vencur investisiyası, kapital, tənzimlənmə.*

İnnovasiya fəaliyyətinin təşkilində və inkişafında fiskal sistemi, vergilər önəmli rol oynayır. İnnovasiya fəaliyyəti ilə vergi sistemi arasında məqsədyönlü əlaqəni təmin etmək üçün vergi islahatlarının daha geniş müstəvidə aparılması, bununla bağlı zəruri prinsiplərin gözlənilməsi vacibdir.

Ölkəmizdə prioritet və innovativ layihələrin maliyyələşdirilməsində müxtəlif maliyyə mənbələrinin iştirakı üçün səmərəli və güzəştli şəraitin yaradılması zəruridir. İnnovasiya fəaliyyətinin genişmiqyaslı inkişafı və onun maliyyə təminatı üçün ölkədaxili vəziyyət nəzərə alınmaqla, investisiyalaşma prosesinə xüsusi diqqət yetirmək lazımdır.Yeniliyəvə riskli inkişaf fəaliyyətinə, yəni innovasiya tədqiqatlarına, tədbirlərinə yönəlmiş vençur investisiyalarından Azərbaycanda istifadənin artıq vaxtı çatmışdır. Vençur investisiyaları maliyyə aləti olaraq, öz riskliliyi və həmçinin yüksək gəlirliliyi ilə fərqlənir. Məhz bu məqsədlə aşağıdakı amillər nəzərə alınmalıdır: vençur investisiyalarının inkişaf imkanları yüksək, intellektual qabiliyyətli potensiala malik kiçik və orta müəssisələrə, sonradan isə onların iri müəssisələrə çevrilməsi; innovasiya və yüksək texnologiyalar birjasının yaradılması; müəssisələrin burada səmərəli fəaliyyəti üçün zəruri hüquqi, texniki və maliyyə təminatının formalaşdırılması.

Əslində, vençur investisiyalaşması prinsipi iqtisadiyyata innovasiya layihələri seçimi üzrə qurulmus mexanizmidir. Bu onu göstərir ki, elmi ideyaların genis spektri innovasiyaların həyat tsiklinin kifayət qədər erkən fazalarında öz perspektivliyinin bazar qiymətləndirilməsini alır. Innovasiyanın bu cür “erkən” seçimi məhdud investisiya resurslarını real iqtisadi sektora uygun gələn istiqamətlərdə cəmləşdirməyə imkan verir.Vençur maliyyələşdirilməsi-maliyyə bazarının dinamik inkişafetməkdəolan seqmentidir, dünya təcrübəsində sübut olundugu kimi, bütövlükdə iqtisadiyyatın inkisafının effektiv katalizatoru sayılır. Vencur bazarlarının maliyyələşdirilməsi sahəsində ən inkişaf etmiş ölkələrə ABŞ, Yaponiya, Almaniya, Böyük Britaniya və Hollandiya şamil edilir. Həmin ölkələr eyni zamanda yüksək texnologiyalı məhsulların ən iri ixracatcıları kimi cıxış edirlər [1, səh.319].O həm də Azərbaycan iqtisadiyyatının texnoloji sektoru üçün əsas inkisaf katalizatoru ola bilər. Hərseydən əvvəl, korporativ və vergi qanunvericiliyinə uygun ölkəninqanunvericilik mühitinin yaradılması ölkənin vençur investisiyalasmasınınınkisafı üçün mühüm əhəmiyyət kəsb edir. Vençur investisiyalar əsasən qapalı və texnoloji yönümlü sirkətlərin maliyyələsdirilməsi üçün tətbiq olunan xüsusi investisiyalasma üsuludur.

Eyni zamanda ölkədə innovasiya fəaliyyətinin inkişafında və onun səmərəli maliyyələşmə sisteminin yaradılmasında vacib addımlardan biri də innovasiya modelinin tədricən yaradılmasıdır.İnnovasiya modelinin yaradılmasına kompleks yanaşmaya, dövlətin iştirakına xüsusi diqqət yetirilməlidir. İnnovasiya modelində dövlətin aktiv investisiya qoyuluşlarında iştirakını aşağıdakı amillərlə xarakterizə olunur: təkmil nəzəri və praktiki biliklərin, peşə vərdişlərinin yüksəldilməsi proseduru perspektiv innovativ inkişafla bağlı müəyyən olunmalıdır; yüksək texnologiyaların tətbiqi sosial iqtisadi inkişafın aparıcı qüvvəsi kimi dəstəklənməlidir; dövlətin bu sahədəki əsas vəzifəsinin elmin və innovativ inkişafın stimullaşdırılması ilə bağlı olmalıdır.

İnnovasiya maliyyələşməsində həm xüsusi kapitaldan, həm də məqsədli dövlət yardımlarından, vergi güzəştlərindən istifadə edilməsi məqsədə uyğundur.

Bu məqsədlə qiymətli kağızlar və fond bazarının inkişafı və onların vəsaitlərinin mobilizə edilməsi də öz səmərəsini verər. Bu baxımdan, ölkədə innovasiya sferasının və onun maliyyələşmə sisteminin inkişafı, stimullaşdırılması ilə bağlı əsaslı islahatların aparılması, bu fəaliyyətin müəssisə və dövlət maraqları ilə uzlaşmasını təmin edəcək mexanizmin yaradılması xüsusi zərurətdən irəli gəlir. Müvafiq uzlaşma mexanizmində innovasiya fəaliyyətinin inkişafı, onun maliyyələşmə sisteminin, hüquqi-normativ bazasının təkmilləşməsi, maliyyə-kredit, vergi və büdcə resurslarından istifadədə geniş səmərə və güzəştlərin təmini, müəssisələrin maliyyə-təsərrüfat fəaliyyətinin müasir tələblər baxımından təşkili kimi mühüm məsələlər nəzərdə tutulmalıdır. Buna görə də Azərbaycanda innovasiya fəaliyyətinin və onun maliyyələşmə sisteminin müasir tələblər baxımından

təşkilində aşağıdakı məsələlərə xüsusi diqqət yetirilməlidir: mövcud hüquqi-normativ bazanın innovasiya və elmi-texniki tərəqqinin inkişafına yönəlməsi ilə bağlı təkmilləşdirilməsi; innovasiya və rəqabət yönümlü müəssisələrin mənfəət və əlavə dəyər vergisindən müvəqqəti azad edilməsi və ya onların vergiyə cəlb olunma bazasının azaldılması; innovasiya və elm tutumlu məhsul istehsal edən milli müəssisələr üçün daha cəlbedici vergi güzəştləri; innovasiya fəaliyyəti, investisiyalaşması, vençur maliyyələşməsi sahəsində risklərin sığortalanma sisteminin səmərəli formasının tətbiqi; innovasiya fəaliyyətinin maliyyələşməsində bank-kredit və büdcə resurslarının istifadəsi ilə bağlı cəlbedici mexanizmin yaradılması.

Müasir şəraitdə innovasiya fəaliyyətinin maliyyələşdirilməsi zamanı aşağıdakıvergi güzəştlərindən və stimullaşdırıcı metodlardan istifadə olunması məqsədəuyğundur: innovasiya və elmi-texniki tərəqqi ilə bağlı aparılan tədqiqatlarda və istehsal prosesində avadanılqların və texnolojı qurğuların aşınmasına sürətli ammortizasiya metodunun tətbiqi; innovasiya tədqiqatlarıvə tədbirləri üzrə çəkilən xərclərdə, innovasiya məqsədilə xarici avadanlıqların və texnologiyaların alınmasına vergi güzəştlərinin tətbiqi; innovasiya və elmitexniki tədqiqatların vergilərdən azad olunması; innovasiya və elm tutumlu məhsul istehsalı ilə məşğul olan müəssisələrin mənfəət, əmlak, əlavə dəyər və torpaq vergisinə güzəştli vergilərin tətbiqi [2, стр202].

Ölkədə innovasiya fəaliyyətinin müasir tələblər baxımından tənzimlənməsində aşağıdakı vəzifələrin icrasının təmini məqsədə uygundur: innovasiya fəaliyyətinin stimullaşdırılması; innovasiya fəaliyyətinin inkişafı ilə bağlı mövcud resursların perioritet istiqamətlər üzrə koordinasiyasının təşkili; elmi-texniki araşdırmaların, rəqabətqabiliyyətli məhsul istehsal edən müəssisələrin fəaliyyətinin genişləndirilməsinə təsir edən yardım mexnizminin təşkili; innovasiya fəaliyyətinin təşkili, tənzimlənməsi və idarəedilməsi üzrə yüksək ixtisaslı, peşəkar kadrların, elmi potensialın formalaşdırılması; ölkədə innovasiya fəaliyyəti ilə bağlı məqsədli proqramların hazırlanması; innovasiya fəaliyyətinin inkişafı ilə bağlı hüquqi-normativ bazanın, vergi, gömrük, maliyyələşdirmə və infrastruktur sisteminin təkmil əsaslar üzərində qurulması.

Azərbaycanda innovasiya fəaliyyətinin təşkilində və tənzimlənməsində hüquqi-normativ və qanunvericilik bazasının yaradılması xüsusi zərurətdən çıxış edir. İnnovasiya fəaliyyəti ilə bağlı qəbul ediləcək hüquqi-normativ sənədlər, qanunvericilik aktları ölkənin Ümumdünya Ticarət Təşkilatına daxil olması baxımından da zəruridir. İnnovasiya fəaliyyətinin spesifik xüsusiyyətlərindən asılı olaraq, onun hüquqi bazası digər fəaliyyət növlərinin tənzimlənməsini təmin edən hüquqi əsaslardan fərqlənir. Bu fəaliyyət növü üzrə hüquqi-normativ baza yaradılarkən innovasiya subyektlərinə olan münasibətdə üç istiqamət əsas olaraq nəzərə alınmalıdır: subyektlərin innovasiya və elmi texniki fəaliyyət üzrə nəticələri; innovasiya fəaliyyətinin və intellektual əməyin tətbiqi nəticəsində maddi-material tutumluluğun nəzərə alınması üzrə istehsal edilən məhsul; intellektual əməyin nəticəsində əldə olunan məhsulun innovasiya fəaliyyətinin digər prosesində istifadə olunma imkanlarının genişlənməsi.

Hazırda dövlət innovasiya-investisiya fondları mikrosəviyyədə innovasiya prosesinin hissə-hissə maliyyələsdirilməsini həyata keçirən əsas institutları kimi çıxıs edirlər. Bu vəsaitlər ciddi məqsədyönlülüyə yalnız innovasiya məhsullarının və yeni texnologiyaların tətbiqi üzrə tədqiqat və isləmələrin maliyyələsdirilməsi məqsədinə malikdir. Bundan basqa, iri miqyaslı elmi-tədqiqat proqramları resursların birləsdirilməsi üzrə müqavilələr əsasında həyata keçirilir.

**ƏDƏBİYYAT**

1.Gülhüseyn Əhmədov.Kənd təsərrüfatında innovasiyaların tətbiqi istiqamətləri.Bakı-2010.səh.479. 2.Лютый И.А., Кулиев Р.А. Инвестиционная деятельность. Учебное пособие. Баку-2009.стр.394

**Роль государства в регулировании инновационной деятельности**

**А.А.Гаджиева**

В статье рассматривается основные направления развития инновационной деятельности в Азербайджане, совершенствование возможной системы финансирования инновационной деятельности в условиях глобального развития, направления формирования механизма регулирования инновационной деятельности.

***Ключевые слова****:инновации, налоговая система, финансирование, капитал, венчурные инвестиции, регулирование.*

**The role of the state in regulating innovation activities.**

**A.A.Hacıyeva**

The article studies the basic directions of the development of the innovative activity in Azerbaijan, the perfecting of the potential system of the financing of the innovative activity in conditions of global development, the formation of the arrangement of legal regulation of the innovative activity.

***Keywods****: Innovation, taxsystem, financing, enthusiastic investment, capital, adjustment.*